*Azərbaycan Aqrar Elmi* **4 2018** *Аграрная Наука Азербайджана*

**UOT: 338.33**

# RƏQABƏTQABİLİYYƏTLİ İSTEHSALIN FORMALAŞDIRILMASI DAVAMLI İQTİSADİ İNKİŞAFIN MÜHÜM ŞƏRTİDİR

**E.Ə.İBRAHİMOV**
**Azərbaycan Kooperasiya Universiteti**

*Məqalədə rəqabətqabiliyyətlilik və davamlı inkişaf arasında qarşılıqlı əlaqə təhlil edilmiş, rəqabətqabiliyyətliliyin formalaşdırılmasına təsir edən amillər və bunun sosial-iqtisadi mahiyyəti izah edilmişdir. Müəllif qeyd edir ki, davamlı iqtisadi inkişafın əsasını rəqabətqabiliyyətli milli istehsal təşkil edir. Yəni rəqabətqabiliyyətli məhsul istehsal edən sənaye sahələri olmadan davamlı iqtisadi inkişafa nail olmaq qeyri-mümkündür. Bu baxımdan da, rəqabətqabiliyyətli sənaye sahələrinin formalaşdırılması davamlı inkişafın mühüm amili kimi tədqiq olunmuşdur. Eyni zamanda, məqalədə rəqabət mühitinə, rəqabətqabiliyyətliliyə təsir edən digər amillər də ətraflı şəkildə təhlil edilərək sərh edilmişdir. Məqalənin yekunu olaraq davamlı inkişafın təmin edilməsi və bu məqsədlə də rəqabətqabiliyyətli sənaye istehsalının formalaşdırılması istiqamətində təklif və tövsiyələr verilmişdir.*

***Açar sözlər:*** *rəqabət, rəqabətqabiliyyətlilik, davamlı inkişaf, sənaye istehsalı, elmi-texniki tərəqqi, standartlaşdırma.*

Müasir dövrdə rəqabətqabiliyyətlilik iqtisadiyyatın hərəkətverici qüvvəsidir. İqtisadi tərəqqini təmin edən rəqabət həm də, milli istehsalın xarici bazarlara çıxışına da müsbət təsir göstərməklə ümumi iqtisadi inkişafa təkan verir. Belə ki, rəqabət qabiliyyətli olmayan milli istehsalın daxili və xarici bazarda üstünlük qazanması qeyri-mümkündür. Bu baxımdan da, rəqabət qabiliyyətlilik müasir davamlı inkişafın da mühüm amili kimi çıxış edir. Nəzərə alsaq ki, inhisarçılıq və rəqabət tərs mütənasibdir, yəni biri gücləndikcə, digəri azalır, aradan qalxır, onda dövlətin iqtisadi proseslərə müdaxiləsinin zəruri olduğunu bir daha əyani görərik.

Baxmayaraq ki, bazar münasibətləri dövlətin iqtisadi proseslərə müdaxiləsini dəstəkləmir, lakin aparılmış tədqiqatlar göstərir ki, bir çox iqtisadi proseslərdə dövlətin müdaxiləsi qaçılmaz olur. Bu da dövlətin tənzimləyici funksiyalarından irəli gəlir. Belə ki, dövlət antinihisar tədbirlərini reallaşdırmasa, iqtisadi subyektlərin bərabər hüquqlu fəaliyyəti üçün ədalətli rəqabət mühiti formalaşdırmazsa, bu istiqamətdə silsilə tədbirlər həyata keçirməzsə normal iqtisadi inkişafdan və rəqabət qabiliyyətli iqtisadiyyatdan danışmaq belə qeyri-mümkündür. Bu baxımdan dövlətin iqtisadi siyasətində məhsulun, müəssisələrin, sənayenin və bütövlükdə milli iqtisadiyyatın rəqabət qabiliyyətinin yüksəldilməsi problemi aparıcı istiqamətlərdən biridir. Bazar iqtisadiyyatı şəraitində dövlət rəqabət qabiliyyətini idarə etmir, müxtəlif tənzimləyici tədbirlərlə - qanunvericilik aktları, hökumət qərarları, iqtisadi və digər tədbirlərlə - ona təsir göstərir. Göründüyü kimi, dövlətin əsas vəzifələrindən biri də ondan ibarətdir ki, təsərrüfat subyektlərinin, sənayenin, milli iqtisadiyyatın rəqabət qabiliyyətlilik səviyyəsinin yüksəldilməsi üçün əlverişli şərait yaratsın.

Ona görə ki, dünya təcrübəsi də sübut edir ki, ölkədə rəqabət üstünlüyünü dəstəkləyən bazar şəraiti olmasa hər hansı bir siyasi qərar müvəffəqiyyətsizliyə məhkumdur ki, bu da davamlı inkişaf baxımından arzu edilən deyil. Düzdür, dövlət və ya hökumət rəqabət üstünlüyü üzərində nəzarəti öz əlində saxlamır, o yalnız bu üstünlüyün formalşmasına təsir göstərə bilir, bunu formalaşdıran mühiti yaradır. Rəqabət qabiliyyəti üzrə siyasəti hazırlayanlar həmin məsələdə çox incə və düşünülmüş hərəkət etməlidirlər. Dövlətin iqtisadi siyasətinin əsas məqsədi məhsuldarlıq səviyyəsini yüksəltmək üçün ölkənin ehtiyatlarını (əmək və kapital) hərəkətə gətirmək, mövcud təbii-iqtisadi resurs potensialından maksimum səmərəli istifadə etməkdir. Çünki məhsuldarlıq əhalinin maddi rifah səviyyəsinin yüksəldilməsində və dövlətin iqtisadi cəhətdən daha da qüdrətlənməsində həlledici məqamdır. Məhsuldarlığın yüksəldilməsi üçün isə, təbii ki, milli iqtisadiyyat durmadan təkmilləşdirilməli, dövrün tələblərinə cavab verən islahatlar həyata keçirilməlidir. Bu isə mövcud sahələrdə yeniliklərin fasiləsiz olaraq tətbiq edilməsi və yeni sahələrlə rəqabət edə bilmə qabiliyyətinin artırılması deməkdir. Aydındır ki, işçi qüvvəsinin tərkibinə yeni daxil olanlar üçün iş yerləri açmaq məqsədilə yeni biznes strukturlarının yaradılması da zəruridir. Çünki məhsuldarlığın yüksəldilməsi öz növbəsində qabaqcıl sahələrdə iş yerlərinin ixtisarına səbəb olur. Rəqabətqabiliyyəti olmayan sahələrdə

isə iş yerləri birbaşa bağlana bilər. Ona görə də dövlətin sənaye siyasətinin əsasını məhz bu dinamizm və tərəqqi təşkil etməlidir. Burada məqsəd ondan ibarət olmalıdır ki, mövcud sahələrdə firmalar rəqabət üstünlüyü səviyyəsini daha yeni, mürəkkəb texnologiya və iş üslubu tətbiq etməklə yüksəldə bilmək üçün əlverişli şərait yaradılsın. Həmçinin, dövlət firmalara yardım etməlidir ki, onlar da daha yüksək məhsuldarlığı mövcud olan yeni sahələrə istiqamətləndirsinlər [2; 3].

Aydındır ki, hər bir ölkənin davamlı inkişafının təməlində əsasən sənaye sahələri dayanır. Yəni yerli istehsal müəssisələri olmadan, rəqabət qabiliyyətli yerli məhsullar olmadan dinamik və davamlı tərəqqi qeyri-mümkündür. Araşdırmalar və qabaqcıl dünya dövlətlərinin təcrübəsi sübut edir ki, sağlam sənaye siyasətinin başlıca şərti - məqsədin düzgün seçilməsidirsə, ikinci vacib şərt isə - rəqabət üstünlüyünün təmin edilməsi və daha da möhkəmləndirilməsidir. Onu da qeyd edək ki, rəqabət üstünlüyünün əsas etibarilə, makroiqtisadi və ya digər amillər ilə müəyyən edildiyi əsas götürülərsə, bu zaman milli sənayeyə təsir göstərilməsi üçün səhv vasitələrdən istifadə olunacaqdır. Belə ki, milli üstünlüyün əsas ünsürü ölkə firmasının öz səviyyəsini yüksəltməsi və yeniliklər tətbiq etməsi ilə əlaqədardır. Rəqabət qabiliyyətinin məhdud, statik şəkildə başa düşülməsi ilə sənayeyə göstərilən dəstək ona uzaq perspektivdə zərər gətirə bilər. Rəqabət üstünlüyü nəzəriyyəsinə görə bu sahədə dövlətin üzərinə çoxtərəfli funksiyalar düşür. Bir çox sahələri əhatə edən genişmiqyaslı və davamlı dövlət proqramı tələb olunur, bu da ondan irəli gəlir ki, ilk baxışda bir-birilə əlaqəsi olmadığı görünən sahələr əslində qarşılıqlı asılılıq vəziyyətindədir. Hər hansı bir sahə üzrə qəbul olunmuş qərarın təsir dərəcəsi, digər sahələr üzrə yeridilən siyasətdən çox asılıdır [3,s.23-34; 8].

Demək olar ki, ayrı-ayrı ölkələrdə raqabət qabiliyyətinin yüksəldilməsinə yönəldilmiş müxtəlif tədbirlər görülür. Mütəxəssislərin fikrincə bu tədbirlərə devalvasiya, özəlləşmə, məmulatların keyfiyyəti və ətraf mühitin çirklənməsi sahəsində standartların yumşadılması, müxtəlif korporasiya və firmalar arasında əməkdaşlığa yardım etmək, birləşmələri stimullaşdırmaq, vergi islahatları, regional inkişaf, kadr hazırlığının təkmilləşdirilməsi, elmi tədqiqatlara ayrılan dövlət xərclərinin artırılması, yeni müəssisələrin maliyyələşdirilməsi üzrə dövlət proqramının qəbul edilməsi və s. aiddir. Öz növbəsində, milli sənayenin rəqabət qabiliyyətlilik səviyyəsinin yüksəldilməsi üçün isə bir sıra tədbirlərdən istifadə edilir. İlk növbədə, kooperasiya layihələri əsasında qabaqcıl texnologiyaların mənimsənilməsi, ETT nailiyyətlərinin tətbiqinin genişləndirilməsi, məhsulun keyfiyyətinin yüksəldilməsi, rəqabətqabiliyyətli yeni növ məhsulların buraxılması məqsədi ilə firmaların innovasiya fəaliyyətinin stimullaşdırılması məqsədəuyğun olardı. Digər tərəfdən, texnoloji səviyyənin durmadan artması, tərəfdaşlarla sıx əməkdaşlığın yaradılması ilə əlaqədar olaraq əmək məhsuldarlığı səviyyəsinin yüksəldilməsi, bu istiqamətdə tədbirlər görülməsi, ölkədə sənayenin bütün sahələrinin dinamik inkişafına imkan verən mühitin yaradılması, kapital qoyuluşunun cəlb olunması və vəsaitlərin optimal bölüşdürülməsi kimi məsələlər də diqqət mərkəzində olmalıdır [5; 7; 8].

Aydındır ki, məcburi və könüllü standartları, sertifikat tələblərini, firmaların, şirkətlərin istehsal fəaliyyətini tənzimləyən təlimatların hazırlanması və müəyyən edilməsi yolu ilə daxili bazarda tələb şərtlərinə təsir göstərilir. Təklif edilən istehsal və ya xidmətlərin xassələri, onların təhlükəsizliyi və ətraf mühitə təsiri haqqında sərt standartlar rəqabət üstünlüyünün yaradılmasına təsir göstərir. Eyni zamanda, dünya miqyasında qəbul edilən standartlara əməl edilməsi xüsusən əhəmiyyətlidir. Onlar dünya bazarında tələb olan məmulatların və xidmətlərin hazırlanmasında milli şirkətlərə xarici rəqibləri üstələməyə imkan verir. Qarışıq sahələrin istehlakçı və satıcılarını əlaqələndirən qarşılıqlı əlaqədar sahələrin inkişafına yardım edilir. Bu məqsədlə yeni layihələrin hazırlanması üçün yüksək texniki potensiala malik olan yerli firmalara və şirkətlərə yardım göstərən dövlət texniki institutları yaradılır.

Qeyd olunduğu kimi, bu tədbirlər silsilə xarakteri daşımalı və hər bir sahənin spesefik xüsusiyyətlərini və inkişaf perspektivlərini nəzərə almalıdır. Konkret olaraq, araşdırmalar göstərir ki, milli iqtisadiyyatda rəqabət üstünlüyünün yaradılması və möhkəmləndirilməsi üzrə siyasət hazırlanarkən bəzi məsələlərin nəzərə alınması məqsədəuyğun olardı. Bütün bunlarla yanaşı, birinci növbədə, rəqabət üstünlüyünü, ilk növbədə müəssisələr özləri yaratmalı, ən azı buna can atmalıdırlar və inkişaf etdirməlidirlər. Təsərrüfat subyektlərinin idarə olunmasında və rəqabət üçün səciyyəvi olan dəyişikliklərin idarə olunmasında dövlətlər adətən müvəffəqiyyət əldə edə bilmirlər. Hətta, onların idarə aparatı ən səriştəli mütəxəssislərdən ibarət olsa da dövlət korporasiyalar adından hansı sahələrin inkişaf etdirilməsi, hansı texnologiyaya kapital goyulması və hansı rəqabət ustünlüyünün daha əlverişli olduğu haqqında qərar qəbul edilməsində yanlışlıq edə bilər. Məhz bu səbəbdən də, təsərrüfat subyektləri özləri bu işdə öndə getməlidirlər. Bu sahədə ən inkişaf etmiş ölkələrin təcrübəsindən kifayət qədər misal göstərmək olar. Belə ki, bəzi hallarda dövlət, sadəcə olaraq bazar oyunlarını kifayət qədər hiss edə bilmir və ona görə də vaxtında və operativ qərarların qəbulu çətinləşir [6; 7; 10].

Əslində rəqabət üstünlüyündə dövlətin rolu yalnız nisbi xarakter daşıyır, çünki ona çoxsaylı amillər təsir edir. Lakin dövlət firmaların, şirkətlərin

fəaliyyətləri ilə əlaqədar olan təsisat strukturlarının formalaşması və inkişafına təsir göstərə bilər. Əlaqədar təsisat strukturlarının səmərəli fəaliyyəti və onların proseslərə bilavasitə müdaxilə etməməsi rəqabət üstünlüyünün yaradılması və inkişafına ciddi təsir göstərir. Burada, dövlətin səciyyəvi rolu daxildə fəaliyyət göstərən qüvvələrə meydan verməkdən və onları gücləndirməkdən ibarətdir. Bununla da fasiləsiz yenilənmə üçün imkanlar və hərəkətverici məqamlar yaradılır. Bu sahədə Yaponiyanın təcrübəsi xüsusilə təqdirə layiqdir. Burada tələbin sürətlə yaranmasını stimullaşdıraraq, sahəni simvolik kooperativ layihələr vasitəsilə qabaqcıl texnologiyanı mənimsəmək zərurəti qarşısında qoyaraq, keyfiyyəti aşkara çıxarmaq və təşviq etmək üçün mükafat müəyyən etməklə ETT nailiyyətlərini və rəqabəti stimullaşdırılır və digər siyasi qərarlar qəbul etməklə yenilənmə tempini sürətləndirməyə, onun ümumi səviyyəsini yüksəltməyə nail olunur. Müşahidələr göstərir ki, dövlət, bilavasitə o sahələrə birbaşa müdaxilə etməlidir ki, orada firmalar və şirkətlər fəaliyyət göstərməyə qadir deyillər və yaxud xarici amillərə görə kifayət qədər kapital qoya bilmirlər [1; 5].

Bir çox hallarda rəqabət üstünlüyü haqqında söhbət problemin yalnız daxili aspekti ətrafında cərəyan edir. Lakin, rəqabət üstünlüyü standartları ölkə daxilində deyil, xarici ölkələrdəki rəqabət tərəfinin də təhlili əsasında müəyyən edilir. Məhsuldarlığın mütləq səviyyəsi digər ölkələrlə müqayisəli nisbi məhsuldarlığa nəzərən az əhəmiyyətlidir. Eyni zamanda, dinamik yeniləşmə məsrəflərin səviyyəsinin qısamüddətli azalmasına deyil, rəqabət üstünlüyünə aparır. Həmçinin, ölkənin rəqabət üstünlüyü həmin ölkədə fəaliyyət göstərən firmaların və şirkətlərin fasiləsiz olaraq yenilənmək qabiliyyətindən asılıdır. Əvvəlki üstünlük son nəticədə hər hansı bir digər ölkənin firmaları və ya şirkətləri tərəfindən kopirovka edilir və yaxud heçə endirilir.

Ölkənin davamlı inkişafının əsasını təşkil edən milli sənayenin tərəqqisi uyğun sahələrin səviyyəsinin yüksəldilməsini də tələb edir. Bol təbii resurslara, ucuz işçi qüvvəsinə, devalvasiya edilmiş valyutaya əsaslanan rəqabət üstünlüyü çox vaxt aşağı məhsuldarlıq səviyyəsi ilə əlaqədardır və qeyri-sabit xarakter daşıyır. Yüksək məhsuldarlıq ilə əlaqədar olan rəqabət üstünlüyü - texnologiya səviyyəsinin fasiləsiz yüksəldilməsi, modellərin daim dəyişdirilməsi, müştərilər ilə sıx əlaqə yaradılması və dünya bazarlarında iştirakı ilə əlaqədar miqyas effektinin nəticəsidir. Praktikada bazarın genişləndirilməsi və onun səviyyəsinin yüksəldilməsi ilə əlaqədar olan rəqabət üstünlüyü isə daha uzunmüddətli olur. Belə ki, sənaye sahələrində rəqabət üstünlüyü üç-dörd illik işgüzar fəallıq nəticəsində deyil, onilliklər ərzində yaradılır. Bu insan professionallığının yüksəldilməsinin, məmulat və proseslərə kapital qoyuluşlarının artırılmasının, klasterlərin yaradılması və xarici bazarlara daxil olmanın nəticəsində yaradılır. Məsələn, Yapon avtomobil istehsalçıları 50-ci illərdə müəyyən modelləri ixrac etməyə başladılar və möhkəm beynəlxalq mövqeni yalnız 70-ci illərdən sonra qazana bildilər [4; 9].

Hər bir ölkədə iqtisadi siyasət praktikada qısamüddətli dalğalanmalar ilə əlaqələndirilir. Dövlətlər, adətən yaxın perspektivdə nəticə verə bilən tədbirlərə - subsidiyalara, himayəçiliyə və şirkətlərin birləşdirilməsinə üstünlük verirlər. Belə tədbirlər isə yeniliklərin tətbiqini ləngidir və əmək məhsuldarlığına mənfi təsir göstərir. Dövlətin sərəncamında olan, rəqabətin təşviqi və tələbin keyfiyyətinin yüksəldilməsi ilə əlaqədar olan amillərin yaradılması rəqabət qabiliyyətliliyə dərhal təsir göstərir. Ona görə də, ölkələr rəqabət üstünlüyünü bənzərliyə görə deyil, fərqə görə əldə edirlər. Hər bir ölkədə yalnız ona xas olan rəqabət sahələri yığımı mövcuddur, və heç bir ölkə bütün sahələrdə rəqabət üstünlüyünə malik deyildir və ola da bilməz. Rəqabətdə müvəffəqiyyət hər bir ölkədə mövcud olan unikal şəraitlə, ayrı-ayrı sahələrdəki rəqabət üstünlüyü mənbələrinin əlaqələndirilməsinin nəticəsidir. Burada tələb, ixtisas səviyyəsi, təhsil xüsusiyyətlərində olan milli fərq də çox əhəmiyyətlidir və müəyyən hallarda rəqabət üstünlüyündə həlledici rol oynayır.

Milli istehsalın rəqabət qabiliyyətinin yüksəldilməsi, dinamik inkişaf etdirilməsi sahəsində qabaqcıl beynəlxalq təcrübədən yararlanmaq mümkün və lazımdır. Eyni zamanda, təcrübə göstərir ki, bəzi müsbət cəhətlərə baxmayaraq başqa ölkələr üçün hazırlanmış iqtisadi modellərə ölkənin milli maraqlarını, ənənələrini və mövcud şəraiti nəzərə almadan həddən artıq bağlanmaq səhvdir. Milli üstünlük əldə edilməsi işində - eyni sahələrdə, eyni strategiya ilə və eyni dövlət proqramı ilə, başqa ölkələrin nümunəsinin olduğu kimi təkrarlanması ölkəyə inkişafda yalnız müəyyən uğurlar əldə etməyə imkan verə bilər və bu əsasən çox qısa müddətli olur. Ona görə də bu cür hallarda hər bir dövlətin başlıca vəzifəsi milli üstünlüyün dərin köklərini müəyyən etmək və onların reallaşdırılması üçün siyasi-iqtisadi təşəbbüslər göstərməkdən ibarət olmalıdır.

İqtisadi inkişaf səviyyəsinin potensial sürəti amillərin kəmiyyət və xüsusən keyfiyyətcə yaxşılaşması ilə müəyyən edilir. Ona görə də dövlətin mühüm və ənənəvi vəzifələrindən biri lazımi amillərin yaradılması və səviyyəsinin yüksəldilməsidir. Bunlara ixtisaslı insan resursları, iqtisadi biliklər, informasiya və infrastruktur təminatı və s. aiddir. Ölkələr üstünlüyə bu gün mövcud olan amillər hesabına deyil, daha çox onların səviyyəsini fasiləsiz olaraq yüksəldə bilən təsisat mexanizminin yaradılması vasitəsilə nail ola bilirlər. Amillərin keyfiyyətini əks etdirən standartlar durmadan

yüksəlir. Dövlətə isə, əsasən lazımi amillərin yaradılması işində bir mühərrik kimi baxılır. Ona görə ki, dövlət ibtidai və orta təhsil sistemi, infrastruktur təminatı, səhiyyə sahəsi və s. istiqamətlərdə cəmiyyətin tələbatının müasir dövrün tələbləri baxımından ödənilməsində məsuliyyət daşıyır. Əgər dövlət bu vəzifələrin öhdəsindən gələ bilməsə və ya layiqincə gələ bilməsə milli sənaye əlverişsiz vəziyyətdə qalmış olacaqdır.

Tədqiqatlar göstərir ki, hər hansı bir ölkənin milli iqtisadiyyatının, o cümlədən sənayesinin səviyyəsinin yüksəldilməsi müasir və mükəmməl infrastrukturun mövcudluğundan çox asılıdır. Bu, xüsusən, qabaqcıl nəqliyyat vasitələri, loqistika və telekommunikasiya üçün daha əhəmiyyətlidir. Çünki, bütün bunlar müasir texnologiyanın tətbiqi və beynəlxalq bazarlarda rəqabət aparılması üçün çox vacibdir. Infrastrukturanın yaradılması və inkişafında firmalar və hökumətlər öz tövhələlrini verirlər. Tarixən, bu məsələdə dövlət aparıcı mövqeyə malikdir, lakin, son dövrlər bu sahədə özəlləşdirmə və xüsusi qurğular yaradılması ilə əlaqədar olaraq firmaların kapital qoyuluşlarının həcmi artir. İqtisadi səviyyənin yüksəldilməsində isə kapitalın real qiymətlə mövcudluğu, onun bank sistemi və digər kapital bazarları vasitəsi ilə investisiya şəklində səmərəli yerləşdirilməsi mühüm əhəmiyyətə malikdir. Dövlət, həm kapitalın dəyərinə və daxil olma mənbələrinə, həm də onun yerləşdirilmə vasitəsi olan bazarlara təsir göstərə bilir. Ölkədə kapitalın miqyasına fərdi yığımların artım sürəti, dövlət büdcəsinin mənfi və müsbət qalığının miqdarı, habelə xarici kapitalın hərəkəti ən çox təsir göstərir. Ümumiyyətlə, iqtisadiyyatda kapital qoyuluşlarının artan məhsuldarlığının maliyyələşdirilməsi üçün büdcə kəsirlərinin azaldılması kapital qoyuluşları üçün ümumi ehtiyatlara təsir etməyin ən yaxşı yoludur. Kapitalın məqsədli bölgüsünün səmərəli mexanizmi kapitalın özünün mövcudluğu gədər mühümdür. Müvəffəqiyyətlə fəaliyyət göstərən, xüsusən isə yeni fəaliyyətə başlayan şirkətlərin ölkədə mövcud olan ümumi kapital ehtiyatlarından ədalətlə istifadə etmək imkanları geniş olmalıdır. Bu onlara yüksək rəqabət üstünlüyü yarada bilməsi üçün çox vacibdir [4; 7].

Müasir beynəlxalq təcrübədə milli iqtisadiyyatın rəqabətə dözümlülüyünü təmin etmək üçün ölkədə mövcud olan informasiyanın kəmiyyət və keyfiyyəti getdikcə daha böyük əhəmiyyət kəsb edir. İnformasiya – firmada və şirkətdə vaxt itirmədən hərəkət etmək zərurətini hiss etmək və ətaləti aradan qaldırmaq üçün bir vasitədir. O, mövcud sahələrdə rəqabət üstünlüyünün yüksəldilməsi və yeni sahələrdə müvəffəqiyyətli rəqabət aparılması işinin ayrılmaz tərkib hissəsidir. Ölkədə informasiya bazası çoxsaylı mənbələr hesabına formalaşır. Firmaların və şirkətlərin sənədləri, texniki nəşrlər, xüsusi informasiya mənbələri və ümumi mətbuat – informasiya bazasını təşkil edir. Ölkələrin çoxunda firmaların əldə edə bildikləri informasiya bazasının genişləndirilməsində (dövlət statistikası və digər mənbələr, məlumatların aşkarlanması qaydalarını müəyyən edən təlimatlat) mühüm rol oynayır. İnformasiyanın toplanması ilə yanaşı, onun mükəmməl yayılma mexanizmi də vacibdir. Bir çox ölkələrdə bu sahədə xüsusi orqanlar yaradılır. Hökumətlər amillərin dəyərinə təsir göstərməklə rəqabət üstünlüyünün yaradılması məqsədilə birbaşa subsidiyalardan geniş istifadə edirlər. Subsidiyalaşdırılan kapital, subsidiyalaşdırılan tədqiqat, subsidiyalaşdırılan xammal və birbaşa dotasiyalar demək olar ki, bütün dövlətlərdə geniş istifadə edilir. Lakin, subsidiyalaşdırma heç də həmişə əsl rəqabət üstünlüyü yarada bilmir, bəzən uğursuzluğa gətirib çıxarır. Ona görə ki, subsidiyalaşdırma firmanın yeni şəraitə uyğunlaşmasını və yeniliyin tətbiq edilməsini ləngidən bir amildir [6; 8; 9].

Beləliklə, rəqabət, rəqabət qabiliyyətlilik və davamlı inkişaf arasında qarşılıqlı əlaqəyə dair aparılan araşdırmalar və müvafiq təcrübə göstərir ki, rəqabət üstünlüyünün təmin olunmasına yönəldilmiş tədbirlər arasında amillərin dəyərinə və mübadilə məzənnəsinə nəzarət etmək məqsədilə amillər bazarına və valyuta bazarına müdaxilə mexaizmi mühüm rol oynayır. Vergi və pul siyasəti, enerji daşıyıcılarının tənzimlənməsinə yönəldilmiş siyasi qərarlar, əmək haqqı, enerji daşıyıcılarının qiyməti, valyuta məzənnəsinin səviyyəsinə ciddi təsir göstərir. Çünki amillərin dəyərinin aşağı olması və uyğun valyuta məzənnəsi beynəlxalq bazarlarda səmərəli rəqabət apara bilmək üçün çox vacibdir. Lakin bu heç də məqsəd olmamalıdır və bütün hallarda bazar mexanizminin də nəzərə alınması vacibdir. Bunlar arasında devalvasiya, istehsal prosesinə daxil olan əmtəə və xidmətlərin qiymətləri, əmək haqqının səviyyəsi, işçi qüvvəsinin dinamikası və s. çox mühümdür.

**ƏDƏBİYYAT**

1.Azərbaycan Respublikasında rəqabətin qorunması və təbii inhiusarların tənzimlənməsi. Qanunlar, normativ sənədlər və analitik materiallar. Bakı, 2000, Antiinhisar Siyasəti və İstehlakçıların Hüquqlarını Müdafiə Komitəsi, 273 səh.; 2. Babayev L.B. "Sənaye müəssisələrinin iqtisadi tənzimləyiciləri". Bakı, ELM, 2000, səh.140; 3. Hacıyev M.Ə. "Sənaye istehsalının iqtisadi stimulunun gücləndirilməsi". Bakı, Azərnəşr, 1997, 152 səh.; 4. İsgəndərov Ç.Ə. "Azərbaycan sənayesinin rəqabətqabiliyyətinin yüksəldilməsi problemləri". Dissertasiya, 2001, s. 92; 5. Vəliyev D.Ə. "Azərbaycan iqtisadiyyatının beynəlxalq rəqabət qabiliyyətinin artırılması yolları". "Azərbaycan Respublikasında iqtisadi islahatlar: ilkin nəticələr, problemlər və perspektivlər" mövzusunda Beynəlxalq elmi-praktik konfransın materialları". Bakı,

Avanqard, MMC, 2003, s. 295-298. 6. Кормнов Ю. «О повышении конкурентоспособности экономики». «Экономист», 2006, № 8, с.11-25; 7. Курнышева И., Лыков С. «Конкурентоспособность и проблемы структурной модернизации». «Экономист», 2008, № 9, стр. 46.; 8. Кучуков Р., Савка А. «Проблемы конкурентоспособности народного хозяйства». «Экономист» 2008, № 9, стр.3-11; 9. О.Н. Петрова «Конкурентоспособность как доминанта устойчивого развития региональной социально-экономической системы». «Экономика и экономические науки», 2014, стр. 35-43. 10. Т.Н.Бабкина «Конкурентоспособность как фактор устойчивого развития промышленного предприятия». М.:, 2010, ЮНИТИ, 180 стр.

**Формирование конкурентоспособного производства как основное условие стабильного экономического развития**

**Э.А.Ибрагимов**

В статье про анализирована взаимосвязь между конкурентоспособностью и стабильным развитием, разъяснены факторы, влияющие на конкурентоспособность и их социально-экономическая сущность. Отмечено, что основу стабильного экономического развития составляет конкурентоспособное национальное производство. То есть, без промышленных отраслей, производящих конкурентоспособную продукцию, невозможно добиться стабильного экономического развития. С этой точки зрения, формирование конкурентоспособных отраслей промышленности исследовано как важнейший фактор стабильного развития. В то же время, в статье подробно проанализированы и другие факторы, влияющие на конкурентную среду и конкурентоспособность. В итоге выдвинуты предложения и рекомендации в направлении обеспечения стабильного экономического развития и, формирования конкурентоспособных отраслей промышленности.

***Ключевые слова:*** *конкуренция, конкурентоспособность, стабильное развитие, промышленное производство, научно-технический прогресс, стандартизация.*

**Formation of competitive production is the main condition for stable economic development**

**E.A.Ibraghimov**

In the article analyzes the relationship between competitiveness and stable development, explains factors affecting competitiveness and their socio-economic essence. The article notes that the basis for stable economic development is a competitive national production.That is, without industrial industries producing competitive products, it is impossible to achieve stable economic development. From this point of view, the formation of competitive industries was investigated as the most important factor of stable development. At the same time, the article analyzed in other detail factors influencing the competitive environment and competitiveness. As a result of the article and for this purpose, the formation of competitive industries proposals and recommendations were put forward in the direction of ensuring stable economic development.

***Keywords:*** *competition, competitiveness, stable development, industrial production, scientific and technical progress, standardization.*

**e-mail: elwen.1977@mail.ru**

